UOT: 331.101.26

# KƏND TƏSƏRRÜFATINDA ƏMƏK RESURSLARINDAN SƏMƏRƏLİ İSTİFADƏ EDİLMƏSİNİN ƏSAS İSTİQAMƏTLƏRİ

**S.R.MUSTAFAYEV**
**AKTN KTİETİ**

*Məqalədə iqtisadi inkişafın indiki mərhələsində kənd təsərrüfatında əmək resurslarından istifadəyə təsir edən amillər araşdırılmış, bu istiqamətdə mənfi və müsbət təsərrüfatların resurslarla təminat səviyyəsi qiymətləndirilmiş və əmək resurslarından səmərəli istifadənin yolları müəyyən edilmişdir.*

***Açar sözlər:*** *kənd təsərrüfatı müəssisələri, fərdi sahibkarlıq, əmək resursları işçi qüvvəsi, resurslarla təminat səmərəlilik.*

Bazar iqtisadiyyatının formalaşması ilə əlaqədar aqrar sektorda təsərrüfatçılığın yeni formaları (kənd təsərrüfatı müəssisələri fərdi sahibkarlıq təsərrüfatları, ev təsərrüfatları) fəaliyyət göstərir və geniş təkrar istehsala keçid sürətlənmişdir. Belə sosial-iqtisadi şərait aqrar iqtisadiyyatın inkişafı əmək resurslarından səmərəli istifadəni təşkil etmək imkanlarını artırır. Bu baxımdan qeyd etmək lazımdır ki, fərdi sahibkarlıq təsərrüfatları iqtisadiyyatın sərbəst sektorunu təşkil edir. Kəndli iqtisadi cəhətdən asılı olmur və öz əmək fəaliyyətində sərbəst qərarlar verir.(5) Digər tərəfdən, iqtisadi rayonlarda aqrar sektorda məşğulluğun səviyyəsində müşahidə olunan yüksəliş, eyni zamanda sahələr üzrə diferensasiya əməyin səmərəli təşkilində və əmək resurslarından istifadə olunmasında stimullaşdırıcı tədbirlərin istənilən səviyyədə olmadığını göstərir. Aqrar məşğulluqda kənd əhalisinin xüsusi çəkisinin yüksək olması, digər tərəfdən təsərrüfatların gəlirlilik səviyyəsinin aşağı olması əməyin təşkilinin səmərəliliyi və əmək məhsuldarlığının artırılması problemlərinin mövcudluğunu göstərir. (4)

Araşdırma göstərir ki, yeni iqtisadi münasibətlər sistemində və mövcud təsərrüfatçılıq şəraitində aqrar sektoda əməyin faydalı təşkili və əmək resurslarından istifadənin səmərəliliyinin yüksəldilməsi aşağıdakı amillərdən asılıdır:

- aqrar sektorda gəlirlilik səviyyəsinin yüksəldilməsi;
- kənd təsərrüfatı əməyinin stimullaşdırılması;
- aqrar əmək bazarında ixtisaslı kadrlarla təminat səviyyəsinin yaxşılaşdırılması;
- kənd yerlərində əmək resurslarının səmərəli bölüşdürülməsi və istifadə edilməsi;
- qeyri-kənd təsərrüfatı sahələrinin inkişafı;
- özəl sektorun inkişafı və investisiyalaşdırılması;
- infrastrukturun ərazi miqyasında inkişafı və təkmilləşdirilməsi;
- aqrar sektorda innovasiyalı istehsalın formalaşması və informasiya təminatının yaxşılaşdırılması;
- aqrar sektorda istehsalın intensivləşməsinin və əmək məhsuldarlığının artırılması.

Aqrar islahatların dərinləşdiyi indiki mərhələdə sosial-demoqrafik proseslərin müsbət dinamika ilə dəyişilməsi, digər obyektiv və subyektiv amillərin (istehsal münasibətləri və məhsuldar qüvvələrin inkişaf səviyyəsi və s.) təsiri nəticəsində əmək bazarının formalaşması, eyni zamanda tələb və təklif arasında disbalansın mövcudluğu, nəticədə iqtisadi fəal əhalinin aktivliyinin aşağı düşməsi müşahidə olunur. Kənd təsərrüfatında əmək fəaliyyətinin təşkilində aşağıdakı bəzi mənfi meyllər özünü biruzə verir:

- kənd əhalisinin əmək qabiliyyətli hissəsinin müəyyən qisminin təbii resurslardan istifadə imkanlarının aşağı olması;
- işçilərin peşə ixtisas tərkibinin transformasiyaya uğraması və onların müasir texnologiyalardan istifadə etmək qabiliyyətlərinin aşağı olması;
- aqrar əmək bazarında işsizlərin sayı və yaradılmış iş yerləri arasında disbalansın mövcudluğu;
- təsərrüfatların gəlirlilik səviyyəsinin aşağı olması.

Əməyin düzgün təşkili istehsalın təşkilinin mühüm tərkib hissəsidir və əmək resurslarından səmərəli istifadə edilməsinə təsir göstərir. Elmi-texniki tərəqqinin iqtisadiyyatın sahələrində (elektrikləşdirmə, kimyalaşdırma, avtomatlaşdırma, kompüterləşdirmə, robotlaşdırma və s.) tətbiqinin və istehsalın təşkilinin təkmilləşməsinin mövcud səviyyəsində aqrar sahədə iş qüvvəsindən səmərəli və məqsədəuyğun istifadə edilməsi prioritet sayılır. Aqrar sahədə iş qüvvəsinin çevikliyi, iş qüvvəsinin bir iş yerindən digərinə hərəkəti, ərazi, sahələr və müəssisələr üzrə iş qüvvəsinin yenidən bölgüsü, bir fəaliyyət növünün yerinə yetirilməsindən digərinə keçid- əməyin dəyişməsi prosesi baş verir.

Aqrar sahədə yeni texnika və mütərəqqi texnologiyanın, kompleks mexanikləşdirmə və avtomatlaşmanın geniş tətbiqi, ixtisaslaşma və istehsal kooperasiyasının inkişaf etdirilməsi, istehsalın texniki səviyyəsinin yüksəldilməsi prosesi əməyin təşkilinin dəyişilməsini və səmərəliliyinin artırılmasının əsas istiqamətlərini təşkil edir. Elm və texnika inkişaf etdikcə əməyin təşkili öz formasında müəyyən qədər dəyişikliklərə uğrayır. Müasir mərhələdə əmək fəaliyyətinin faydalılığının artırılması, əməyin təşkilinin müasir iqtisadi şəraitə uyğunlaşdırılması prosesi gedir və bu istiqamətlərdə problemlərin mövcudluğu da müşahidə olunur.

Aqrar sahədə əmək resurslarından istifadənin yaxşılaşdırılması digər iqtisadi fəaliyyət sahələrində olduğu kimi ixtisaslı kadr seçimindən, iş yerlərinin təşkili və işçilərin sayından, işçinin təbii resurslar, maliyyə resursları, texniki resurslarla təmin olunma səviyyəsindən asılıdır. Kənd təsərrüfatında əməyin təşkilində ilkin şərt kimi müəssisə və təsərrüfatların kənd təsərrüfatına yararlı torpaqlar, əsas fondlarla və işçi qüvvəsi ilə təmin olunması çıxış edir

Təhlil göstərir ki, 2011-2016-cı illərdə, kənd təsərrüfatı müəssisələrinin sayında 17%, 2015-2016-cı illərdə 4% azalma müşahidə olunur. Digər tərəfdən isə müəssisələrin ümumi torpaq sahəsi uyğun olaraq həmin müddətlərdə 6% artmış, 2,5% azalmışdır, kənd təsərrüfatına yararlı torpaq sahələri 17,1%-3,4% artmışdır. Əkin yeri 13,1% artmış, 0,9% azalmışdır.

Təhlildən görünür ki, aqrar sahədə əmək fəaliyyətinin təşkili üçün imkanlar artır. Bu kənd təsərrüfatına yararlı torpaq sahələrinin artması ilə əlaqədardır. Digər tərəfdən təhlil göstərir ki, 2015-2016-cı illərdə kənd təsərrüfatı müəssisələrində əkin yerlərindən istifadənin səviyyəsində azalma meyli müşahidə olunur. Yəni kənd təsərrüfatına yararlı torpaq sahələrinin əkinə yönəldilməsi 2015-ci ildə 49,2%, 2016-cı ildə 47,2 % təşkil edir. Bu faktorlar kənd təsərrüfatında, xüsusən bitkiçilikdə əmək fəaliyyətinin təşkilinə, əmək resurslarından istifadənin səviyyəsinə təsir göstərir. Nəticədə işçilərin sayında azalma müşahidə olunur.

**Cədvəl 1.**

**Kənd təsərrüfatı müəssisələri və fərdi sahibkar təsərrüfatların sayı, orta ölçüsü**

| | 2011 | 2012 | 2013 | 2014 | 2015 | 2016 | 2016-2011,% | 2016-2015,% |
|---|---|---|---|---|---|---|---|---|
| **Kənd təsərrüfatımüəssisələri:** | | | | | | | | |
| Kənd təsərrüfatı müəssisələrinin sayı, vahid | 1917 | 1774 | 1669 | 1701 | 1659 | 1592 | 83,0 | 96,0 |
| Ümumi torpaq sahəsi, ha | 218760 | 224472 | 227078 | 226512 | 237773 | 231786 | 106,0 | 97,5 |
| Kənd təsərrüfatına yararlı torpaq, ha | 183903 | 189935 | 195635 | 195535 | 208415 | 215524 | 117,1 | 103,4 |
| Əkin yeri, ha | 89830 | 95007 | 95485 | 100316 | 102594 | 101651 | 113,1 | 99,1 |
| **Kənd təsərrüfatı müəssisələrinin orta ölçüsü:** | | | | | | | | |
| Ümumi torpaq sahəsi, ha | 114,1 | 126,5 | 136,1 | 133,2 | 143,3 | 145,6 | 127,6 | 101,6 |
| Kənd təsərrüfatına yararlı torpaq, ha | 95,9 | 107,1 | 117,2 | 115,0 | 125,6 | 135,4 | 141,2 | 107,8 |
| Əkin yeri, ha | 46,9 | 53,6 | 57,2 | 59,0 | 61,8 | 63,8 | 136,0 | 103,2 |
| **Fermer təsərrüfatları:** | | | | | | | | |
| Təsərrüfatların sayı, vahid | 2593 | 2451 | 2334 | 1624 | 1534 | 1468 | 56,6 | 95,7 |
| Ümumi torpaq sahəsi, ha | 43691 | 48466 | 44267 | 34101 | 33363 | 30424 | 69,6 | 91,2 |
| Kənd təsərrüfatına yararlı torpaq sahəsi, ha | 41575 | 47271 | 43072 | 33224 | 32530 | 29780 | 71,6 | 91,5 |
| Əkin yeri, ha | 28919 | 35584 | 33280 | 24032 | 23379 | 20704 | 71,6 | 88,5 |
| **Fermer təsərrüfatlarının orta ölçüsü:** | | | | | | | | |
| Ümumi torpaq sahəsi, ha | **16,8** | 19,8 | 19,0 | 21,0 | 21,7 | 20,7 | 123,2 | 95,4 |
| Kənd təsərrüfatına yararlı torpaq sahəsi, ha | 16,0 | 19,3 | 18,5 | 20,5 | 21,2 | 20,3 | 126,8 | 95,7 |
| Əkin yeri, ha | 11,2 | 14,5 | 14,3 | 14,8 | 15,2 | 14,1 | 125,9 | 92,7 |

Təhlildən görünür ki, kənd təsərrüfatı müəssisələrinin sayının azalması, torpaq resursları ilə təminatın yaxşılaşması ilə müşaiyət olunur. Bu amil əmək proseslərinin və əmək resurslarından istifadənin səmərəli təşkilində mühüm rol oynayır. Müqayisə müddətində kənd təsərrüfatı müəssisələrinin orta ölçülərinin (bir müəssisənin təbii resurs təminatı) dəyişilməsi (inkişafı) prosesi müşahidə olunur. Belə ki, bir k/t müəssisəsinə düşən ümumi torpaq sahəsi 2011-2016-cı illərdə 114,4 ha-145,6 ha arasında dəyişir, artım tempi 27,1%, k/t yararlı torpaq sahəsi ha–145,6 ha arasında dəyişir, artım tempi 38,9% təşkil edir. Əkin yeri 48,2 ha-61,8 ha arasında dəyişir, artım tempi 28,2% təşkil edir.

Kənd təsərrüfatı müəssisələri ilə müqayisədə fərdi sahibkar təsərrüfatlarında əmək prosesləri, əməyin təşkili səviyyəsi nisbətən aşağıdır. Belə ki, 2011-2016-ci illərdə təsərrüfatların sayı 41,4% azalmışdır. Fərdi sahibkarlıq təsərrüfatlarının torpaq resursları ilə təminatında azalma meyili təqribən 30%, k/t yararlı torpaqlar 28,4%, əkin yeri 28,4% təşkil edir. Eyni zamanda təhlil göstərir ki, təsərrüfatların orta ölçülərində artım meyilləri

mövcuddur. Yəni fərdi sahibkarlıq təsərrüfatlarının irilənməsi prosesi gedir. Təsərrüfatların orta ölçüsünə görə (bir təsərrüfata düşən) torpaq resursları ilə təminat aşağıdakı kimi variasiya edir. Ümumi torpaq sahəsi ilə təminat (orta ölçüsünə görə), 2011-2016-cı illərdə 16,8ha–20,7 ha, kənd təsərrüfatına yararlı torpaq sahəsi ilə təminat 16,0 ha–20,3 ha, əkin yeri 11,2 ha–14,1 ha arasında dəyişmişdir. Təhlil göstərir ki, fərdi sahibkarlıq təsərrüfatlarının orta ölçüsü kənd təsərrüfatı müəssislərinin orta ölçüsündən aşağı səviyyədədir. Fərdi sahibkarlıq təsərrüfatlarında ümumi torpaq sahəsinin orta ölçüsü kənd təsərrüfatı müəssisələri ilə müqayisədə 7,0 dəfə kənd təsərrüfatına yararlı torpaq sahəsinin orta ölçüsü 6,7 dəfə, əkin yerinin orta ölçüsü 4,3 dəfə aşağıdır. Bu amillər fərdi sahibkarlıq təsərrüfatlarında işçi qüvvəsinin əmək proseslərinə cəlb edilməsini və əməyin faydalı təşkilini aşağı salır.

Müasir şəraitdə əməyin səmərəliliyinin təşkilinin əsas istiqamətlərinə aşağıdakıları aid etmək olar.

Səmərəli əmək bölgüsü və əmək kooperasiyası;

- ✓ əmək proseslərinin təşkilinin təkmilləşdirilməsi;
- ✓ əməyin mühafizəsi və texniki təhlükəsizlik üzrə tədbirlər;
- ✓ işçilərin mədəni– texniki və peşə ixtisasının artırılması üzrə tədbirlər;
- ✓ mütərəqqi əmək üsulları və əmək fəndlərinin tətbiqi;
- ✓ iş yerlərinin təşkili;
- ✓ işçilərin maddi və mənəvi həvəsləndirilməsi;
- ✓ əməyin normallaşdırılması.
- ✓ kənd təsərrüfatına yararlı torpaq sahələrinin əmək prosesinə cəlb olunması səviyəsi;
- ✓ əməyin mexanikləşmə səviyyəsinin yüksəldilməsi;
- ✓ istehsalın texnoloji prosesinin təşkili;
- ✓ istehsalın ixtisaslaşması və təmərküzləşməsi;
- ✓ müəssisəyə onun istehsal bölmələrinin operativ təsərrüfat müstəqilliyinin təmin edilməsi;
- ✓ işçilərin sayının optimallaşdırılması və onların mədəni-texniki səviyyəsinin yüksəldilməsi və maddi stimullaşdırmanın təşkili.

**Əmək resurslarından səmərəli istifadənin təşkilinin əsas prinsiplərinə aşağıdakılar daxildir :**

- ✓ əmək məhsuldarlığının yüksəldilməsi əsasında işçilərin həyat səviyyəsinin yaxşılaşmasının təmin edilməsi;
- ✓ əmək şəraitinin yaxşılaşdırılması;
- ✓ işçilərin yaradıcı təşəbbüsünün inkişaf etdirilməsi və müəssisə daxili ictimai münasibətlərin təkmilləşməsi;
- ✓ şəxsi və kollektiv maddi maraq prinsipinin düzgün əlaqələndirilməsi.

Təhlil göstərir ki, kənd təsərrüfatı müəssisələrinin sayının azalması işçilərin sayının azalması ilə müşaiyət olunur, 2015-2016-ci illərdə işçilərin sayında artım meyli nəzərə çarpır. Bu, müəssisənin və işçilərin və k/t təyinatlı əsas fondlarla təmin olunma səviyyəsindən asılı olmuşdur. Əməyin təşkili və əmək resurslarından i iustifadə olunması, ilk növbədə əmək prosesində adamların və texnikanın birgə fəaliyyəti başa düşülür. Əməyin təşkili və əmək resurslarından səmərəli istifadə olunması istehsal prosesində istehsal münasibətlərinin və məhsuldar qüvvələrin inkişaf səviyyəsinin təsiri altında baş verir, işçilər arasında əmək bölgüsünün müəyyənləşməsi, əmək proseslərinin rasionallaşdırılması məsələləri meydana çıxır.

Təhlil göstərir ki, işçilərin sayı və onların əmək proseslərinə cəlb olunması təsərrüfatların və işçinin fondlarla silahlanma səviyyəsindən asılı olaraq müəyyənləşir. Təhlil göstərir ki, bir k/t müəssisəsinə düşən əsas istehsal fondları 2011-2016-cı illərdə 62%. 2016-ci ildə 2015-cü ilə nisbətən 132 % artmışdır. Bir k/t müəssisəsinə düşən k/t təyinatlı əsas istehsal fondlarının artım səviyyəsi uyğun müddətlərdə artmışdır. Digər tərəfdən, əsas istehsal fondlarının tərkibində k/t təyinatlı əsas istehsal fondlarının xüsusi çəkisi artır. Müşahidə olunan bu meyl iş yerlərinin sayının müəyyənləşməsinə təsir göstərir. 2014-2015-2106-cı illərdə bir müəssisəyə düşən işçilərin sayı 8,6-9,4 nəfər arasında dəyişmiş, artım trempi 4,6% təşkil etmişdir. Əməyin təşkilində əməyin mükafatlandırılması mühüm rol oynayır. İnsanın əmək proseslərinə cəlb olunması, ilk növbədə, onların iqtisadi maraqlarının təmin olunmasından irəli gəlir və həyat şəraitinin yaxşılaşmasına xidmət edir. Qeyd etmək lazımdır ki, işçilərin əmək gəlirləri iqtisadi fəal əhalinin istehsal vasitələri ilə birgə fəaliyyətinin əsasında formalaşır,eyni zamanda əməyin təşkilinin səmərəliliyini xarakterizə edir. Təhlil göstərir ki, kənd təsərrüfatı müəssisələrində 2011-2015-ci illərdə işçilərə hesablanılan əmək haqqı fondu 30,3%, 2014-2015-ci illərdə 3,5% artmışdır. 2015-ci ildə bir işçinin orta aylıq əmək haqqı fondu 206 manat təşkil edir. 2011-2016-ci illərdə bu göstəricinin səviyyəsində inkişaf müsahidə olunsa da, iqtisadiyyatın digər sahələri ilə müqayisədə aşağıdır.

Aqrar sektorda fərdi sahibkarlıq təsərrüfatlarında əmək prosesləri,işçilərin sayı və əməyin təşkili səviyyəsi onların k/t yararlı torpaq resurları ilə təminat səviyyəsindən asılı olaraq müəyyənləşir. Bu amil kənd təsərrüfatında əməyin təşkili və əmək məhsuldarlığının səviyyəsinim dəyişməsinə öz təsirini göstərir. Belə ki, 2011-2016-cı illərdə əmək məhsuldarlığı təqribən 2 dəfə, bir işçinin orta illik əmək haqqı fondu 40,9% artmışdır.(3) Yəni əmək məhsuldarlığının artım səviyyəsi ilə əmək haqqının artım səviyyəsi arasında uyğunsuzluq mövcuddur.

Uyğunsuzluğun əmələ gəlmə səbəbləri sırasında xalis mənfəətin həcmi mühüm göstəricidir. Həmin müddətdə xalis mənfəətin həcminin artım tempi 14 ,8% təşkil etmişdir.

İnkişaf etmiş ölkələrin təcrübəsi göstərir ki, aqrar sektorda torpaq, əmək, maddi-texniki resurslardan səmərəli istifadə edilməsində fermer təsərrüfatları əsas təsərrüfatçılıq formasıdır. Qeyd etmək lazımdır ki, aqrar iqtisadiyyatda özəl sektorun inkişafına dövlət səviyyəsində qayğı göstərilir. Bu da imkan verir ki, fermer təsərrüfatları potensial imkanlarından tam istifadə edə bilsin.

Aqrar iqtisadiyyatın liberallaşdırılması və şaxələndirilməsi ilə əlaqədar fərdi sahibkarlıq təsərrüfatlarına maraq artır. Müasir aqrar iqtisadiyyatda həmin təsərrüfatların iqtisadi əsası kimi xüsusi mülkiyyət (torpaq sahələri) çıxış edir və kiçik və orta sahibkarlığın inkişafının əsas təsərrüfatçılıq formalarından birini təşkil edir. Azərbaycanda fermer təsərrüfatları ailə xarakterini daşıyır, ailənin bir üzvünün vasitəsi ilə kommersiya əsasında təşkil olunur və sahibkarlıq fəaliyəti üçün imkanlar yaranır. Bu təsərrüfatlarda həm kənd təsərrüfatı məhsulları istehsalı, həm onun realizasiyası şəxsi əməyin tətbiqi nəticəsində meydana gəlir. Bu təsərrüfatların üzvləri ailənin başçıları və uşaqları hesab olunur. Kənd təsərrüfatı məhsulları istehsalının xüsusiyyətlərindən irəli gələrək, muzdlu işçilər işə qəbul olunur.

Təhlil göstərir ki, fərdi sahibkarlıq təsərrüfatlarının sayının azalması işləyənlərin sayının azalması ilə müşaiyət olunur və eyni zamanda kənd təsərrüfatına yararlı torpaqlarla təminatın səviyyəsində aşağı düşmə meylləri özünü biruzə verir.

Kənd təsərrüfatı və emaledici sahələrdə yeni iş yerləri açmaqla işdən kənarlaş.anları işlə təmin etmək olar. İnvestisiyaların olmaması aqrar sektorda yeni iş yerlə\rinin açılmasına maneçilik törədə bilər. Ancaq qeyd etməliyik ki, hazırda respublikamız investisiya tələb edən ölkədən, investisiya qoymaq imkanlarına malik ölkəyə çevrilmişdir və sənayeləşdirmənin inkişafına qədəm qoymuşdur, kənd təsərrüfatına subsidiyalar, aqrolizinqlər və s. tədbirlər nəticəsində yeni iş yerləri yaradılır. Əmək bazarının formalaşmasına kənd təsərrüfatı və emal sənayesində istehsalın mövsümi xarakter daşıması əmək redurslarından səmərə\li istifadə olunmasına böyük təsir göstərir. Əmək ehtiyatlarından daha çox aşağı mexanizasiyaya malik kənd təsərrüfatı bitkilərinin yetişdirilməsində (tərəvəz, meyvə, giləmeyvələr və s.) nəzərə çarpır. Məsələn, toxumlu meyvələrin yığılmasına böyük bağçılıq təsərrüfatlarına **müvəqqəti mövsümi işçilər cəlb edirlər. Bu da daimi işçilərin sayını bir neçə** dəfə üstələyir. Payız-qış dövründə kənd təsərrüfatı müəssisələrinin daimi işçiləri, xüsusilə bitkiçilikdə, işlə *f* təmin oluna bilmirlər. Bu da vacib faktor kimi9 kənddə gizli işsizliyin mənbəyi olur. . İşsizliyin artmasının səbəbi məşğul olmayan əhali ilə əlaqədardır (evdar qadınlar). Əmək bazarı siyasətinə, kənd əhalisinin əmək qabiliyyətli hissəsinin müdafiəsinə, daha doğrusu, işini itirmiş, səmərəli işləmək arzusunda olan və yeni növ iş fəaliyyəti axtaran insanlara dövlət dəstəyi tədbirləri yönəldilməlidir. Əmək bazarının inkişafının dövlət tənzimlənməsinin əsas istiqaməti-məşğulluğun artırılmasının stimullaşdırılması, dövlət sektorunda iş yerlərinin sayını artırmaq, muzdlu fəhlələrin işə qəbuluna şərait yaratmaq,, işsizlərə yardım (posobiya) ayrılmasına nail olmaqdan ibarət olmalıdır.

**NƏTİCƏ**

. Kəndin əmək resursları aqrar istehsalın resurs potensialını təşkil edir. Təhlil göstərir ki, son illərdə aqrar sektorda əmək resurslarından istifadənin səviyyəsində azalma meyli müşahidə olunur. Digər tərəfdən təhlil göstərir ki, son illərdə qəbul edilən dövlət proqramları çərçivəsində aqrar sahəyə diqqət artırılır(2).

Əmək resurslarının formalaşması və istifadə edilməsində sosial-iqtisadi amillər mühüm reol oynayı.

- iqtisadiyyatda struktur dəyişiklikləri;
- əmək bazarının mövcud vəziyyəti;
- institsional dəyişikliklər;
- ailələrin maddi rifahı və s.

Ölkədə demoqrafik göstəricilərin səviyyəsində müşahidə olunan artım meylləri və sabitləşmə əhalinin yaş-cins strukturunun dəyişilməsi əmək resurslarından səmərəli istifadə edilməsi problemlərini meydana gətirir.

Kənd yerlərində əmək resuslarının formalaşması və ondan istifadə edilməsinin yaxşılaşdırılması problemlərinin həllində müəyyən çətinliklər özünü biruzə verir:

- kənd yerlərində demoqrafik göstəricilərin dəyişilməsi və əmək resurslarının tərkibinin formalaşmasına təsiri;
- kənd yerlərində qeyri kənd təsərrüfatı sahələrinin zəif inkişafı;
- şəhər yerləri ilə müqayisədə kənd yerlərində sosial infrastrukturun inkişafının geri qalması;
- əmək qabiliyyətli əhalinin, xüsusən gənclərin əmək bazarında iştirakının zəif olması (xüsusən gənclərin kənd təsərrüfatı əməyinə marağın zəif olması və onların digər iqtisadi fəaliyyət sahələrinə axını);
- əmək qabiliyyətli əhalinin peşə yönümünün bir çox hallarda əmək bazarında tələblərə uyğun gəlməməsi;
- kənd təsərrüfatı əməyinin stimullaşdırılmasının muzdlu işçilərinin iqtisadi maraqlarını tam ödəməməsi;

- kənd yerlərində əmək resurslarının peşə və orta ixtisas təhsilinin aşağı olması və s.

əmək bazarı ilə təhsil sisteminin qarşılıqlı əlaqəsi regional iqtisadiyyatın tələblərinə uyğun kadrların hazırlanmasını tələb edir. Bu da regional səviyyədə əmək bazarında tələb və təklif arasında disbalansın yaranmasına səbəb olur.

Araşdırma göstərir ki, yeni iqtisadi münasibətlər sistemində və mövcud təsərrüfatçılıq şəraitində aqrar sektorda əməyin faydalı təşkili və əmək resurslarından istifadənin səmərəliliyinin yüksəldilməsi aşağıdakı amillərdən asılıdır:

- aqrar sektorda gəlirlilik səviyyəsinin yüksəldilməsi;
- kənd təsərrüfatı əməyinin stimullaşdırılması;
- aqrar əmək bazarında ixtisaslı kadrlarla təminat səviyyəsinin yaxşılaşdırılması;
- kənd yerlərində əmək resurslarının səmərəli bölüşdürülməsi və istifadə edilməsi;
- qeyri-kənd təsərrüfatı sahələrinin inkişafı;
- özəl sektorun inkişafı və investisiyalaşdırılması;
- infrastrukturun ərazi miqyasında inkişafı və təkmilləşdirilməsi;
- aqrar sektorda innovasiyalı istehsalın formalaşması və informasiya təminatının yaxşılaşdırılması;
- aqrar sektorda istehsalın intensivləşməsinin və əmək məhsuldarlığının artırılması.

## ƏDƏBIYYAT

1. 2008-2015-ъи иллярдя Азярбайъан Республикасында йохсуллуьун азалдылмасы вя давамлы Инкишаф Дювлят Програмы. Бакы -2008-ъи ил. 2. Азярбайъан Республикасы реэионларынын сосиал-игтисади инкишафы щаггында Дювлят Програмы (2008-2015-ъи илляр) Бакы - 2008-ъи ил). 3.Азярбайъанын статистик эюстяриъиляри -2017. Азярбайъан Республикасы Дювлят Статистика Комитяси. Бакы - 2017-ъі ил. 4.Гасымова.E.İ. Kənd yerlərində əhalinin məşğulluq v\ gəlirlilik səviyyəsinin yüksəldilməsi məsələləri. KTN KTİ elmi-tədquqat institutunun elmi əsərləri. Bakı-2010. 5. Вишневская Нина Геннадьевна «Трудовые ресурсы сельской местности: проблемы и перспективы развития». Башкирский Государственный Университет, Россия, Уфа 2014г.

**Основные направления эффективного использования трудовых ресурсов в сельском хозяйстве**

**С.Р.Мустафаев**

В статье исследованы факторы, влияющие на использование трудовых ресурсов в нынешнем этапе экономического развития. В этом направлении дана оценка уровню обеспечения хозяйств трудовыми ресурсами, положительным и отрицательным тенденциям, определены пути эффективного использования трудовых ресурсов.

***Ключевые слова:*** *сельско-хозяйственные предприятия, частное предпринимательство, трудовые ресурсы, рабочая сила, эффективное обеспечение.*

**The main directions of effective use of a manpower in agriculture**

**S.R.Mustafayev**

In article the factors influencing use of a manpower in a present stage of economic development are investigated. In this direction an assessment is given to the level of providing farms with a manpower, positive and negative tendencies, ways of effective use of a manpower are defined.

***Key words:*** *agricultural enterprises, private business, manpower, labor, effective providing.*